# MƏNİM BİR ARZUM VAR!!!

İndi bu yazacaqlarım, yəni tam olaraq yazmaq istədiklərim.. açığı bunlara oxucunun inanıb inanmayacağından bir o qədər də əmin deyiləm. Çünki bu sətirləri yazarkən ağlımdan keçən hadisələr özümə də yuxu kimi görünür… Hər halda yazıram. Niyə yazmağımın səbəbini isə hazırda düşünmək istəmirəm, Bəlkə çap etdim, bəlkə də yox. Bilmirəm. Sadəcə olaraq yazıram, vəssalam….Haqqında danışacağım hadisə payızın əvvəllərində Azərbaycanın paytaxtı olan Bakı şəhərində baş vermişdi… o gün sabah bir az gec durmuşdum, hətta buna sabah da demək olmaz, sadəcə mən bunun sabah olduğunu düşünürdüm. Təxminən saat gecə beş, ya da altı olardı. Hə, elə buradaca onu da deyim ki, mənim bir otaq yoldaşım da var və  ayılıb gördüm ki, evdə heç kim yoxdur və mən mənə baxan çox hörmətli divarlarla başbaşayam. Bu arada onu da demədən keçə bilməyəcəm ki, bu divarların mənim üçün bu qədər əhəmiyyət daşımasının bir səbəbi də yatağımın yanındakı divarın üstündə mənim qara markerlə

yazdığım:” I have a dream” sözləridir. Bu yazını oxuyacaq şəxsin biliyinə şübhəm olmasa da, bu sözlər haqqında qısa da olsa bir məlumat verməliyəm. Bir vaxtlar qaradərili insanlara qarşı edilən ədalətsizliyin qarşısında dimdik duran Martin Lüter King bu sözləri demişdi: **“I have a dream”-Mənim bir arzum var**. Biz bu evdə otaq yoldaşımla bərabər kirayə qalırdıq və mən gecə o yatarkən əlimə markeri alıb telefonumun işığı ilə bu sözləri divarın mənim yatağım tərəfinə düşən qisminə böyük hərflərlə yazmışdım, amma görünür o gecə ürəyim soyumayıb ki, sabahkı axşam yarım qalan işimi bitirmək məqsədi ilə bir dəfə daha gecə macərasına atılaraq bu yazıların üzərindən qara markerlə getdim ki, tam aydın görünsün. Deməli, sabah otaq yoldaşım qalxıb divarın halını görəndə mənim adımı hansı əsəblə qışqıraraq çağırdığını yəqin ki, izaha o qədər də ehtiyac yoxdur. Açığı onu da başa düşürəm, o da fikirləşirdi ki, ev yiyəsi gələndə ona nə cavab verəcək. Nə etmək insanın öz evi olmayanda belə olur. Amma eybi yox, məndə ki bu istək var hansı divar olmağından asılı olmayaraq öz işimi görə bilərəm. Sadəcə otaq yoldaşım mənim kimi deyildi. Odur ki, başladı məni

danlamağa. Sonra da dedi ki, gəl bunu silməyin bir yolunu tapaq. İş orasında deyildi, axır bir yolunu tapıb silmək olardı, amma mən tərs adam olduğumdan yazdığım bu sözləri heç kimin pozmasına icazə verməzdim. Otaq yoldaşım əslində bunu bilirdi, sadəcə bir dəfə şansını yoxlamaq istəmişdi. Görəndə ki, mən yazdıqlarımı siməyəcəm oturub ev yiyəsi ayın axırında, yəni mən o yazını yazdığımın sabahı günü evə gəldikdə nə deyəcəyini fikirləşməyə, bir az sonra da yazdıqlarımı gizlətməyin yollarını axtarmağa başladı. Amma yenə idea mənim özümdən çıxmışdı. Ev yiyəsi evə gələndə otaq yoldaşım mənim xəstələndiyimi, yəni qrip olduğumu deyəcəkdi və əlbəttə ki, xəstə insandan ölümdən qaçan kimi qaçan ev yiyəsi qapıdan ayağını içəri atmadan gəldiyi kimi də gedəcəkdi. Bax beləcə problemi yaradan mən problemin həll yolunu da irəli sürmüşdüm. Artıq məsələnin həll olunduğunu görən otaq yoldaşım ingilis dilində bilmədiyindən orada nə yazdığımı soruşdu və mən də yalan demək istəmədiyimdən ona cavab verdim. Bunun ardınca məndən nəyə görə belə bir şey yazdığımı və arzumun nə olduğunu soruşdu. Düzü , bir o

qədər əmin deyildim, yəni bir çox arzum var idi əlbəttə, yoxsa niyə hələ də yaşayaydım ki? Amma mənə bu sözləri yazdıran arzum bildiklərimin heç biri deyildi. Sadəcə onu bilirdim ki, içimdə özümün də bilmədiyim fərqli bir istək, izah edə bilmədiyim fərqli bir şey var və o artıq partlamağa hazır vəziyyətdədir. Otaq yoldaşıma da bu şeyləri izah edə bilmədiyimdən dedim ki, nə bilim elə belə yazmaq istədim və yazdım , səbəbini də bilmirəm. Açığı elə doğurdan da səbəbini bilmirdim. Sanki **gözəgörünməz** bir qüvvə bu sözləri mənə yazdırmışdı....indi ayıldığım bu gündə də ev sahibinin gəlməli olduğu ayın axırı idi, amma maraqlısı burası idi ki, evdə otaq yoldaşım olmadığı kimi ev sahibindən də əsər yox idi. Yəni o gələn də evi yoxlaması təqribən bir neçə saat  çəkirdi, hətta bəzən sabah gəlib axşam evdən çıxırdı. Sonra birdən xatırladım ki, dünən divara yazdığım sözlərin gizlədilməsi üçün ev sahibinə mənim xəstə olduğumu deyəcəkdik və özlüyümdə yəqin etdim ki, mən yatılı olanda o gəlib və otaq yoldaşım, yəni artıq onun adını sizlərə demək vaxtı məncə gəlib çatıb, odur ki, Günəş, ona mənim qrip olduğumu deyərək içəri girməyinə imkan vermədən onu yola

salıb. Amma axı o gün bazar günü idi, bu necə ola bilərdi, Günəş həmişə bazar günlərini özünün sabahdan axşama qədər yatmaq günü elan etdiyindən onu yataqdan belə çıxarmaq çətin məsələ idi. Bu olanları başa düşməyə çalışa-çalışa yerimdən durmaq üzərəykən qapının açıldığını hiss etdim. Günəş təlaşla içəri girib çarpayısının üzərində oturaraq ağlamağa başladı. O qədər içdən ağlayırdı ki, sanki bütün dünya dağılmış və o da altında qalmışdı. Mən cəld yerimdən qalxaraq onun yanında əyləşdim və əlimi çiyninə qoyub ona nə olduğunu soruşdum, amma elə bil məni eşitmirmiş kimi ağlamağına davam edirdi və heç mənim üzümə də baxmırdı. Və aha bu nə demək idi?... Günəş məndən ötrü ağlayırmış. Yəqin ki bu bir oyundur deyə fikirləşdim. Axı mənə nə olub ki, mənə görə ağlayır? Bunu onun özündən də soruşdum, amma cavab ala bilmədim. Və cavab ala bilməməyim məni tamam hövsələdən çıxardı, elə davranırdı ki, sanki mən burada heç yoxmuşammış kimi. Günəşin axı Dəniz haradadır, hara gedə bilər, üstəlik bütün paltarları, telefonu, pul qabısı da evdədir dediyi an keçirdiyim şok hissini heç bir sözlə ifadə edə bilmirəm(Bu yerdə onu da deyim ki,

Günəşin **Dəniz** dediyi şəxs mənəm...) Bu nə cür bir zarafat idi, yəni ümumiyyətlə bu nə idi? Başlanğıcda tam olaraq fikirləşirdim ki, bu bir zarafatdır və onun qollarından tutaraq və gözünün içinə baxaraq  dedim ki, bəsdir, bu zarafata son ver, özü də bu dəqiqə!!! Amma yox, Günəş mənim səsimi deyəsən doğurdan eşitmirdi. Axırda tamam hövsələdən çıxdığımı hiss etdim və artıq dayana bilməyərək qışqırdım ki, necə yəni sən məni görmürsən indi?! Bu sözlərimə də heç bir reaksiya vermədiyini görüncə ayaxa qalxdım və əsəbdən otağın içində var gəl etməyə başladım. Bütün bu əsəblərimi dəhşətli bir qorxuya çevirən o an, o an ki ondansa, əsəbləşmək daha yaxşı olardı..yəni ən azından həmin anda tək düşündüyüm şey bu idi....Otaqda var-gəl edəndə gözüm  Günəşin yatağı tərəfdəki divarda asılı olan güzgüyə sataşmışdı və mən özümü görmüşdüm, daha doğrusu **görə bilməmişdim**.. bu nə demək idi. Mən özümü necə görə bilməzdim? Artıq əmin idim ki, yüz faiz yuxu görürdüm. Amma bir yandan da daxilimdən gələn bir səs  bunun yuxu olmadığını deyirdi və deyəsən bu səs haqlı idi. Şokun təsirindən çıxmağa çalışdığım bir zamanda, yəni təxminən yarım

saatlıq bir müddətdə özümü görə bilmədiyim gözgüyə **baxmağa** davam edərkən yenidən Günəşin səsini eşitdim və sanki yuxudan ayılımış kimi o tərəfə çevrildim. Günəş polisə zəng etmiş və mənim qəfildən yoxa çıxmağım barəsində polislə nə isə danışırdı... Yox bu dəqiq bir zarafat idi, axı hələ günorta da olmamışdı, yəni əgər heç bir əşyamı almamış evdən çıxmış olsam belə, bu qədər tez polisə zəng etmək məntiq qanunlarına da zidd idi. Birdən Günəşin polisə bir aydır itən bir adamı necə ola bilər ki, hələ də tapmayıblar dediyini eşitdim. Necə? Bu dəqiq zarafat olmalı idi, bir aydır ki, mən durmadan yatmışam və bu müddətdə aclıqdan və ya susuzludan da ölməmişəm(kim bilir bəlkə də ölmüşəm). İndi isə qətiyyən nə aclıq, nə də susuzluğum var. Günəş bir müddətdə onlarla nəsə danışıb sonra telefonu söndürdü və yenidən ağlamağa başladı. Nəsə deyirəm, çünki bir ay məsələsindən sonra nə danışdıqlarını dinləməyə taqətim qalmamışdı, sadəcə olaraq bütün bunların nə demək olduğunu düşünürdüm. Elə o an durandan bəri hiss etdiyim şeyi, daxilimdə olan adını deyə bilməyəcəyim fərqli bir şeyi xatırladım. Bu sanki fəqli bir güc idi, hə, tam olaraq indiyə

qədər hiss etmədiyim bir güc. Sonra bu həngamənin ortasında zarafatımdan geri qalmamaq naminə dedim ki, eh Dəniz, Dəniz, mən bilirəm bu güc haradan gəlir, bir ay durmadan kim yatsa enerjili olar. Amma bu zarafatın təsir müddəti bir neçə saniyə davam etdi və mən real dünyaya qayıtdım, yəni əgər bu dünyaya real demək mümkün idisə. Və artıq bir az sonra məsələnin həllini tapmağın yollarını fikirləşməyə başladım. Bu işin içindən necə çıxa bilərdim? Günəşin məni görməsi üçün işə yaramaz bəzi cəhdlərdən sonra bunun həll yolu olmadığını başa düşdüm və fərqli bir yol axtarmağa başladım. Elə o an ağlıma bir fikir gəldi, hərçənd bunun nə qədər faydalı olacağından əmin deyildim, amma yoxlamaqdan da bir ziyan gəlməzdi, yəni bundan artıq nə ziyan gələ bilərdi? Hansı ağıllasa fikirləşmişdim ki, problem güzgüdə və Günəşin gözlərindədir. Hərçənd mən özümə baxdığım zaman mən də özümü **görə bildiyimdən** qətiyyən əmin deyildim, amma insan bəzən çətin anda ona ümid kimi görünən hər şeydən yapışa bilir. Bu əsasla da çölə çıxdım və insanların arasına qarışdım. Küçənin ortasında bir də yadıma düşdü ki, gecə paltarımla çölə çıxmışam, amma kaş ki, heç

bunu xatırlamayaydım. Çünki bunu xatırladığım an onu da fikirləşdim ki, artıq insanların məni görüb görmədiyini yoxlamaq üçün onları test etməyə ehtiyac yoxdur. Əgər görmüş olsaydılar mütləq mənə baxıb gülməli idilər. Artıq onların məni görmədiyinə əmin olmuşdum. Amma ehtiyat igidin yaraşığıdır ata sözünü və igid olmaq üçün mütləq kişi olmalı deyilsən Dəniz sözünü əsas alaraq küçənin ortasında var gücümlə bağırmağa qərar verdim. Əslində bu mənim hər zaman arzu etdiyim və bir gün mütləq həyata keçirməliyəm dediyim bir şey olduğu üçün böyük bir zövqlə bağırmağa başladım. Bu inanılmaz idi, amma həm də real idi. Heç kim mənə gözünün ucuyla da olsa, qınaq dolu baxışları ilə baxmamışdı. Bu mənim gözə görünməz olduğumun təsdiqi idi. Amma o an qəribə bir şey oldu-mən artıq bu işdən xoşlanmağa başlamışdım. Və artıq başıma gələn bu hadisədən qorxmaq yerinə onu dəyərləndirmək haqqında fikirləşirdim. Bu şeyləri götür-qoy edə edə evə qayıdanda yolda bir şeyin daha fərqinə vardım-əynimdə yalnız gecə paltarım olduğu halda və payız ayında qətiyyən mənə soyuq deyidi. Buna görə də qərar verdim-bundan sonra evə getməyəcəkdim və mənə

verilmiş olan bu gücü istifadə edəcəkdim. Nəticədə avtobusa, metroya və hətta təyyarəyə belə minə bilərdim. Açığı təyyarə sözü məni tamam həyəcanlandırmışdı. Düzdür, daxildən bir səs-böyük bir ehtimalla vicdanım deyirdi ki, axı bu nəqliyyatlara minmək üçün pul ödəməlisən və ödəməsən bu sənin pis bir insan olduğunu göstərər ki, o zaman da insanlar sənə nə deyər? Amma mən də bu səsin cavabını lazımı şəkildə verməkdən çəkinməyərək dedim ki, əziz vicdanım, əvvəla sənin dediyin o insanlar məni indi görmürkü də qınaya, ikincisi belə bir fürsət bir də ələ düşəcəkmi, yoxsa yaxında əvvəlki kimi görünəcəmmi bilmirəm və nəhayət səni susdura biləcək ən yararlı cavab isə, bu arada onu da deyim ki, bunun ən güclü cavab olacağını nəzərə alaraq onu ən sona saxlamışam, budur ki, bəs yaxşı səncə  bu nəqliyyatlara pul vermək nə qədər ədalətlidir? Əgər dünyada pul deyilən bir şey olmasaydı və insanlar işlərini görərək ehtiyacları olan şeyləri də pulsuz əldə etsəydi daha ədalətli olmazdımı? Açığı bu bu suallar mübahisəyə kifayət qədər açıqdır və bu haqda irəlidə bir daha danışacammı bilmirəm, amma dəqiq olan bir şey var idi ki, vicdanımın səsini

susdura bilmişdi. Lakin əvvəlcə etmək istədiyim şeylər haqqında konkret qərarlar verməli idim. Açığı nəsə bir şey haqqında o qədər də tez qərar verə bildiyim deyilə bilməz,məsələn, bir kitab oxumaq istəyirəm və əvvəldən gələcəkdə oxuyacağım kitablar siyahısını açıb baxıram. Amma əvvələcə sadəcə olaraq baxıram, çünki axı necə ola bilər ki bir kitab digər kitabdan üstün olsun. Bir halda ki, mən o kitabları birinci dəfə oxuyacam və içində yazılanları da sadəcə olaraq təxmin edə bilərəm. Yəni bu adi bir misaldı. Həyatımdakı digər bütün şeylərlə bağlı da vəziyyət demək olar ki, eyni cürdür, amma eybi yox, hərhalda ən kritik anda tez qərar verə bilirəm. Bu sətirləri oxuyacaq şəxs əgər oxuyacaqsa, soruşa bilər ki, bəs onda necə qərar verə bilirsən? Çox sadə- düşünmürəm, sadəcə olaraq edirəm və bunun ən effektiv metod olduğunu da yaxşı bilirəm. Odur ki, bu hadisə başıma gələndə də çox düşümək yerinə tez bir şəkildə hərəkətə keçdim və qərar verdim. Mən bunları fikirləşə-fikirləşə birazdan gecə olacağını da nəzərə alırdım. Odur ki, ilk olaraq təcrübə etmək istədiyim şey mənim üçün mübahisəsiz aydın idi. Ümumən cəmiyyətdə belə bir fikir var ki, gecə çölə

çıxmaq o qədər də yaxşı deyil. Amma bağışlayın ,deyəsən, tam ifadə edə bilmədim qadının, qızın gecə vaxtı çölə çıxmağı yaxşı deyil. Məncə, bu milliyyət məsələsi də deyil, sadəcə olaraq bəşəriyyət məsələsidi. Hər nəysə indi gəlin bu şeyləri bir tərəfə qoyaq və mətləbə keçək. Yəni mənim etmək istədiyim şey məlum idi. Bütün gecə yolları dolaşacaq və nə baş verdiyinə baxacaqdım. Təbii ki, birinci bir az qorxdum və hər zamankı kimi ailədən olan şəxslərin, məktəbdə və universitetdə müəllim və hətta bir üst səviyyədə professorların mənim belə bir şey edəcəyimi bilsələr nə reaksiya verəcəklərini fikirləşirdim ki, elə o anda görünməz olduğumu xatırladım.  Və dərindən bir nəfəs aldım. Bu nəfəsin ardından gözləməyə başladım. Gözləmək deyəndə ki, bu elə çox bir vaxt deyildi. Təxminən bir-iki saat sonra gecə yarısına yaxınlaşırdıq, amma əsas məsələ gecə yarısından sonra şəhərdə nələr baş verdiyini bir qız olaraq görə bilmək kimi böyük bir şərəfə nail olmaq idi. Gəcə gəlib çatana qədər onu da deyim ki, mən bu hadisə baş verəndə tələbə idim və bir az yuxarıda haqqında qısa məlumat verdiyim şəxs isə-mənim otaq yoldaşım əslində həm də qrup yoldaşım idi.

Amma nə etmək olar deyəsən mən onun qədrini yaxşı bilməmişdim. Çünki onun mənim yoxluğumdan ötrü keçirdiyi narahatlıq hissini yatsam yuxumda da görə bilməzdim, yəni buna inanmırdım. Demə, heç də mənim fikirləşdiyim kimi deyildi. Onun mənə bu qədər dəyər verməyi hər nə qədər xoşuma gəlsə də, özümü bir az da günahkar hesab edirdim. O elə də söhbətcil sayılmazdı və məni sevdiyini bir dəfə də olsun deməmişdi. Yəqin ona görə deyirlər ki, insanlara sağlığında dəyər verin. Açığı universitetdə baş verənlər və müəllimlərim haqqında indi danışmayacam, çünki bu hadisədən onlar da öz payını almış və mənim təcrübəmin qurbanı, bəlkə də mən onların təcrübəsinin qurbanı olmuşdum. Nəysə, nəysə. Bu işlər uzun məsələdir və biz ora hələ çatmamışıq. Nəhayət, gecə tam mənası ilə ətrafı öz səssizliyinə, insanlar isə gecəni öz səslərinə bürüdüyü zaman gəlib çatmışdı. Çünki fikirləşdiyimin əksinə olaraq gecələrdə insanların bol olduğunu artıq görmüşdüm. Mən gecənin olmasını bir ağacın altında bir-iki saat oturaraq gözləmişdim. Burada oturaraq gəlib keçən inanlara, onların üz ifadələrinə, əsəbi şəkildə

danışıq tərzlərinə, bəzilərinin, amma həqiqətən də sadəcə bəzilərinin gülüşlərinə, yəni səmimi gülüşlərdən danışıram, burada baxa və fikir yürüdə bilmişdim. Düzü mən bu insanları hər gün gördüyümü düşünürdün əvvəllər, amma o gün başa düşdüm ki, məgərsə mən bu insanlara sadəcə **baxır** və **görmürəmmiş**. Çünki görmüş olsa idim, bir dəfə də olsa evə gedib doyunca ağlayardım....... artıq gecə saat 2-3 olardı və mən küçələrdə hələ ki, təkbaşıma gəzirdim. Elə o anda adını dəqiq xatırlamadığım bir əsərdə oxumuş olduğum bu cümlələr yadıma düşdü: “ya hər şey tərsinə olsa idi, insanlar gecə gündüz etdiyi şeyləri etsəydilər və gündüz də gecə kimi yatsaydılar?” Amma bunu kim yazıbsa, dəqiq xatırlamasam da, o an bu ağlıma gəldi ki, onda da boğazımızdan yapışacaqlar ki, bəs qız uşağı gündüz vaxtı çölə çıxmaz. Sonra özlüyüm də fikirləşdim ki, amma Dəniz öz aramızdır, bu yazıçı kim olubsa lap sənin kimi niyə göydən alma düşür, amma armud, portağal düşmür deyənlərdən olub. Mən bu fikirlərimlə məşğul ikən arxadan bir avtomobilin yaxınlaşdığını hiss etdim, əvvəl bir az narahat oldum. Nə də olsa gecə vaxtı bir qız küçədə tək başına gedirsə bu işdə bir iş var

deyən insanlarla çevrili olduğumu unutmamışdım, nəticədə başımın görünməz olmağı, onun olmadığı mənasını vermirdi.  Bundan artığını düşünməyə vaxt olmadan avtomobil mənim yanımdan keçdi və irəlidə bir evin həyətinin qarşısında dayandı. Amma mən artıq görünməz olduğumu xatırlamışdım və gizlənmək üçün heç bir əsas yox idi. Ona görə də dayandığım yerdən tərpənmədim və avtomobili izləməyə başladım. İçindən əvvəl bir qadın düşdü. əgər oxucu onun görkəmi haqqında fikirləşirsə, narahatçılığa ehtiyac yoxdur, indicə təsvir edəcəm. Bəli, o eyniylə bizə deyilən və onlar kimi olmağımızı məsləhət bilmədikləri həmin qadınlardan birinin görkəmi necə ola bilərsə elə idi. Yolu aydınlatan işıqlar onu təpədən dırnağa qədər görməyimə imkan verirdi. Əynində bir qırmızı rəngdə, yəni daha dəqiq və səmimi olmaq lazımdırsa, yetərincə, yox deyilə biləçək qədər qısa bir don var idi. Açığı mən bunu tənqid etmək fikrində deyiləm, bu da onun zövqüdür, amma əgər zövqü üçün geyinmişdirsə? Dəqiq deyə bilmərəm, bəlkə də zövqü üçün geyinmişdi, düzü mən çoxdandır ki, insanları xaricinə yox, daxilinə görə dəyərləndirməyə çalışıram.......yaxşı, yaxşı, ən

azından çalışıram. Saçları əgər düz görə bilmişəmsə, qara rəngdə idi. Dodaqlar haqqında bir o qədər əmin deyiləm, çünki kənardan qırmızı rəngdə dodaq boyası vurulmuş olan o dodaqlar böyük görünürdü, amma bu boyasız da böyük olduğunu sübut etmədiyi üçün əmin deyiləm. Əslində onun da ancaq 20, ya 21 yaşı olardı, yəni mənim kimi. Gözlərini çox bəyənmişdim. Çünki hər nə qədər öz rolunu ifa etməyi yaxşı bacarıb o gözlərə fərqli hisslər əlavə etmişdisə də, dərinlikdə o yaşda bir gənc qızın gözlərində görə biləcəyim təmizlikdə var idi, bəlkə bir az dərinliklərdə idi, amma var idi. Çünki bəzi şeylər nə qədər basdırılsa da, **görmək** istəyən hər zaman görür... Ümumi dəyərləndirmə aparmalıyamsa, deyə bilərəm ki, bu 20-21 yaşlarında gözəl bir xanım idi. Boyu da yetərincə uzun idi, amma ayaqqabısının dabanları onu olduğundan daha uzun göstərirdi. Mən bu qadının gözəlliyi ilə o qədər dərinliyə kimi maraqlana bilməmişdim ki, digər qapı, yəni sürücünün qapısı da açıldı. Oradan uzun boylu, arxa tərəfdən baxanda saçları ağarmış olan bir kişi endi. Bir dəqiqə.... Bir dəqiqə.... əvvəlcə burada razılaşaq ki, mən bura qədər həttə bundan bir az sonraya

qədər də ağlıma pis bir şey gətirməmək üçün əlimdən gələni etmişdim. Bəlkə bu qız həmin kişinin qızı, nəvəsi, qohumu və hətta bəlkə həyat yoldaşı da ola bilərdi. Mən bunların heç birinə təəccübkənmək və ağlıma da başqa bir şey gətirmək fikrində deyidim,yəni o fikirdə olmamağa çalışırdım, amma bu mənzərə sadəcə olaraq diqqətimi çəkmiş və gözəgörünməz olduğum ilk gecəmdə qarşıma çıxan ilk macəram kimi durduğundan sadəcə seyr edirdim. Bir az sonra o kişi arxasını çevirmədən avtomobilin önünə keçdi və həmin xanımı da əli ilə yanına çağırdı. Onu da deməyi borc bilirəm ki, avtomobil Range Rover markalı idi. Onlar önə keçdikdə **görə bilmədiyim** üçün içimdən mənə get və orada olanları öyrən deyə əmr edən **maraq hissinin buyruğuna** uyaraq yavaş-yavaş irəlilədim. Eh,eh, eh, görəsən niyə tez tez heç kimin məni **görə bilmədiyini** unudurdum. Nəysə nəhayət onların tam yaxınlığında idim. Və bu yaxınlıqdan onların öpüşdüyünü görmək o qədər də çətin deyildi. Şübhəsiz, bu heç də atanın, babanın öpüşündən deyildi. O anda fikirləşdim ki, yəqin sevgili, ər-arvad və ya bu qəbildən bir əlaqələri var. Oxucunun da marağının mənimki

qədər güclü olacağına inanaraq bu öpüşü burada qısaca təsvir edirəm. Əvvəla bu öpüşdəki ehtirası qeyd eləməliyəm. Ağsaçlı adam qızın dodaqlarına öz dodaqlarını sanki heç vaxt ayırmayacaqmış kimi yapışdırmışdı. Qız isə bu ehtirasla dolu öpüşə heç bir hərəkəti ilə qarşı gəldiyini göstərmirdi. Bir az sonra kişinin əlləri qadının bütün vücudunda Avropa turuna çıxmağa qərar verdi. Bu toxunuşlarda onun ehtirası bir üst səviyyəyə çatmışdı. Əgər dəqiq bir izah vermək lazımdırsa, insan, yəni ən azında mənim kimi bir tələbə acından ölərək evə gəlir və görür ki, bu nədir Allahın pomidor-yumurtası tapılmayan evdə üçbacı dolması və əlini filan yumadan atılır yeməyin üzərinə və o anda kimsə desə öldüm kömək et vecinə də olmur. Bax belə ,görünür, ağsaçlı adamın vəziyyəti də belə idi. Bir az sonra ən pik həddə çatanda kişi qadının geyiminin üzərindəki kurtqasını çıxardıb kənara fırlatdı və onun boynunu öpməyə başladı, bəli bu mənim kimi bir tələbənin bibər dolmasından aldığı birinci diş idi. Bunun ardınca özünə hakim ola bilməyib bir az öncə ötəri izah verdiyim donu da küçədə çıxartmaq istədiyində görünür qadın evə keçmək istədiyini

bildirdi, amma kişinin hərəkətlərindən belə məlum oldu ki, o bunu burada da edə bilərdi. Mən isə o anda fikirləşdim ki, bunun səbəbi......fikirlərimi sonra deyəcəm. Bu ana qədər o kişinin üzünü görə bilməmişdim, çünki mən bunu görmək üçün avtomobilin qarşısına keçməli idi.  Mən isə yanında idi. Ona görə də qadını buradan tam aydınlığı ilə görsəm də, kişini görə bilmirdim. Lakin **maraq** başqa şeydir.... birdən onların evə doğru getmək üçün hərəkət etdiklərini gördükdə yənə öz halımı unudaraq arxaya dönüb qaçmağa başladım. Bir-neçə metr sonra gözəgörünməzliyim yadıma düşdü və arxama çevriləndə qapıdan içəri girmək üzrə olduqlarını gördüm. **Gördüm**, amma yenə də kişinin üzü görünmürdü. İş işdən keçib deyərək özümü qapıya çatdırdım və onlarla birgə içəri atıldım. Arxalarınca gedərkən gördüyüm mənzərə isə bir az öncə çöldə gördüklərimin davamı idi. Görünür, ağsaçlı adam badımcan dolmasına çatana qədər həvəsini qaçırmamaq üçün bibəri yeməyə davam edirdi. Evin qapısına çatdıqda kişi cibindən bir açar çıxararaq qapını açmaq istədi, amma bibər onu özündən aldığı və başqa bir aləmə apardığı üçün açar düz 3 dəfə əlindən yerə düşdü. Nəhayət

30 dəqiqə sonra qapı açılmışdı. İti ağıla sahib oxucu fikirləşə bilər ki, bu işin bu qədər uzun çəkməsi o qədər inandırıcı deyil. Amma indi mən deyəcəm ki, hər dəfə kişi yerə düşmüş açar üçün əyiləndə, qız da onunla bir yerdə əyilir və o da yarım qalan işinə orda davam edirdi, hərdən də yadına düşəndə əlini qapının kilidinə atırdı, onda yəqin ki, inanmamağa heç bir əsas da qalmayacaq. Bir də mənim vaxtı bu qədər dəqiqliklə haradan bilməyim məsələsi var ki, onu da əvvəldə deməyi deyəsən unutmuşam. Mənim saatım demək olar ki, ayrılmaz dostum olduğundan onu qolumdan çimərdən çimənə çıxarıram. Hətta otaq və qrup yoldaşım olan Günəş bundan ötrü bir neçə dəfə mənə iradını bildirib, amma mən öz tərsliyimdə qalaraq yenə də bu vərdişimdən əl çəkməmiş saatımla bərabər yatmağa davam etmişdim. Və gecə saat üçdə tanımadığım bu yerdə mənim bu tərsliyim görünür köməyimə gəlmişdi...bir az sonra evin içində olan kişi və qız təbii ki, qapını örtməyin qayğısına qalmamışdılar. Çünki hadisələrin pik nöqtəsində kimin nə vecinə olsun qapı. Mən də içəri daxil oldum və bir an əvvəl o kişinin üzünü görüb bu evi, yəni təxminən ikimərtəbəli bu villanı tərk etməyi

planlaşdırdım. Mən başımı onlara tərəf çevirəndə qızın çılpaq olduğunu gördüm. Çox gözəl bir bədənə sahib olan, yəni əgər sahib idisə, bu qadın ağsaçlı adamın əlləri arasında bir an gözlərimə badımcan dolması kimi göründü. Evin girişində sol tərəfdə bir güzgü var idi amma güzgü hər nə qədər onların olduğu, yəni sağ tərəfi əks etdirsə də, onlar işıqları yandırmadıqlarından mən kişinin üzünü hələ də görə bilməmişdim. Gözgüdən 4-5 metr o tərəfdə yuxarı çıxan pilləkənlər var idi. Amma birinci mərtəbədə isə böyük, təxminən üçtərəfli bir divanı seçə bilirdim. Onun qarşısında isə bir masa var idi. Az keçmişdi ki, yuxarıya doğru çıxmaq üçün kişi o qadını sözün həqiqi mənasında öpüşləri ilə boğaraq pilləkənlərə doğru gətirdi və artıq burada onun üzünü rahatlıqla görmək şansım olacaqdı. Elə bu an ağsaçlı adam yuxarıya çıxmağı vaxt itkisi hesab edərək işini döşəmənin üzərində həll etməyə qərardi və qadının əynində oxucunun da təxmin etdiyi qalmış olan sonuncu iki geyimi də çıxararaq onunla birgə döşəməyə atıldı. Böyük bir hərisliklə qadının bədənini sanki bir canavar kimi parçalayırdı. Birdən qadının digər tərəfində yerdə oturulu olaraq onun bədənini seyr edib əlini onun

üstündə gəzdirirdiyi anda masanın qarşısındakı pəncərədən içəri düşən ay ışığı onun üzünü aydınlatdı və o an qarşımda kimin dayandığı artıq mənə məlum idi. Əvvəlcə **heyrətimdən** heç nə haqqında fikirləşə bilmədim. Bir neçə dəqiqə sonra özümə gəlib donum açıldığı zaman o artıq qadının bədənində özü üçü ən dəyərli yeri tapmış və iş başına qoyulmuşdu. Heç nə demədən, yəni nəsə desəm də, eşidilməyəcəkdi onsuzda, ordan çıxanda beynimdə heç nə haqqında fikirləşmirdim. Bəli, tamami ilə heç nə. Gördüyüm şeyin məndə hansı hissi oyatdığını belə dəqiq başa düşə bilmirdim. Mən.. axı necə hiss etməli idi. Bu onun həyatı və onun seçimi idi. Yaxşı bəs, məni narahat edən, daha doğrusu sözün bitdiyi yerə gətirən nə olmuşdu. Bunu, yəni bu hisssizliyi yazıya tökmək və izaha çalışmaq bəlkə də əbəsdir. Çünki bir insan nə hiss yaşadığını bilmirsə hansı hissi təsvir edə bilər axı. Amma həqiqət olan bir şey var idi, o da içəridəki kişinin mənim 71 yaşlı, evli, iki uşağı olan universitet professorum olmağı idi. Mən çox da hər şeyə təccüb etməyənlərdənəm. Bu hadisənin mənə bu qədər təsirini isə başa düşə bilmirdim...birdən həmin gün, bəli həmin gün yadıma düşdü.. o

mühazirə günü. Bir az əvvəl içəridə gördüyüm bu professor əxlaq haqqında  fikirlərini bizimlə bölüşməyi özünə borc bilmişdi....keşkə bilməyəydi.. mühazirənin gedişində namusdan, onun qadının və kişinin həyatındakı yerindən geniş-geniş danışmış və bir qrup insanlar deyə kateqoriya ayıraraq onların haqqında da öz mülahizələrini söyləmişdi. Bunlarla yetinməyi professor adına ləkə bildiyində dayanmamış və qız uşağının gecə çölə çıxması məsələsinə də toxunmuşdu. Onun sözlərinə görə də gecənin bu vaxtı gənc bir qızın çölə çıxmağı uyğun deyildi. Yəqin edirəm ki, o vaxt kişinin namusunun da önəmli olduğunu deyəndə **"qadın kişinin namusudur"** psixologiyasını əsas alıbmış. Yəqin gecə qız uşağının çölə çıxmamalı olduğunu da deyən də indiki kimi hadisənin baş verməməsini arzu edibmiş. Amma gecənin onun işinə hər cür yaradığı göz qabağında idi. Bir müddət sükutdan sonra mən artıq yenidən küçəyə çıxmış və hara getdiyimi bilmədən yol getməyə başlamışdım. Artıq heç nə haqqında fikirləşmirdim. İndi əsas məsələ 3 dən 5-ə qədər olan zaman kəsiyində gecənin mənə, ya da bizim gecəyə nə göstərəcəyimizə şahidlik etmək qalırdı.  İş orasında

idi ki, gecə artıq göstərəcəyini göstərmişdi və mənim ikinci şoka o qədər də halım qalmamışdı. Bir az götür-qoy etdikdən sonra qərara gəldim ki, onsuz da artıq dördə işlədiyinə görə bu gecəki macərama son verim və bir yerdə oturaraq bu olanlar haqqında sağlam bir başla fikir yürüdüm. Əgər bu qədər gec, yəni saat iki üç civarında qaranlıq küçələrə girməyib daha tez işə başlasa idim, bəlkə də daha çox şeylər görəcəkdim. Nəticə də mənim bu vaxtı gözləyənə qədər oturduğum yer nə qədər olmasa da, göz qabağı idi arada bir polislər də görünür deyə orada bir az əvvəl gördüyüm şeyləri görməməyim yəqin ki, normal idi. Amma insan övladı həmişə belədir, **səhv etmədən çətin ki, düzü görə bilsin**. Beləcə, az sonra küçənin sol tərəfində bir ağacın altında oturmağa qərar verdim. Ora çatanda bir ağaca baxdım, bir də özümə. Bəlkə də, tək özümə yox, özümüzə. Bu ağaca baxmaq mənə daha çox rahatlıq verirdi. Təkcə ona görə yox ki, payız mənim ən sevdiyim fəsildir, həm də ona görə ki, ondan mənə elə bir ziyan gəlməz, əksinə bizdən ona ziyan dəyə bilər. Yerində durmuş ağaca da imkan vermirik ki, rahat otura. Birdən sanki içimdən bir

səs mənə bu dediklərimi ağaca da deməyimi və ondan üzr istəməyimi əmr edirmiş kimi hiss etdim və bunları dedim: “salam, ağac. Bilirəm mən indi etdiyim şeyi həmişə etmək istəmişəm, amma sən də bilirsən də əgər bunu indiyə qədər etmiş olsa idim, yəqin ki, indi dəlixanada olmalı idim. İnsanlar məni səninlə danışan görsələr elə fikirləşərdilər ki, dəli olmuşam, başıma hava gəlib. Mənə görə isə səninlə danışmaq çox təbii bir şeydir. Hələ bəlkə vacib bir şeydir də. Həmişə universitetə, işə, ümumən harasa gedəndə sənin digər dostlarını görürəm, görürəm və düşünürəm ki, siz gecə də, gündüz də eyni yerdə olursunuz, insanların bu gecə macəralarını da yəqin görürsünüz. Amma bir yandan da sizlər öz taleyinizə hakim deyilsiniz. Yəni ancaq bir yerdə dayanmağa məhkum olmusunuz, ancaq bir insan əli ilə olduğunuz yerdən başqa yerə daşınırsınız. Bizim sizdən fərqimiz də elə bundadır biz öz taleyimizin üzərində....açığı bu sözləri dediyim zaman bunun həqiqiliyinə şübhə edirəm. Nəysə səni çox sevirəm, sadəcə bunu bil bəsdir. Düzdür, siz də hər fəsildə yarpaqlarınızın rəngini dəyişirsiniz, amma ən azından əvvəldən dəyişməyəcəyiniz haqda yalan məlumat

vermirsiniz. Hamı bilir ki, indi rəngarəng olub mənim könlümü oxşayan bu yarpaqlar yazda yamşaşıl olacaq. Amma dediyim kimi biz bunu bilirik, biz insanlara məxsus ikiüzlülük( və hətta buna çoxüzlülükdə deyə bilərik, çünki texnikanın inkişafı, elimin nailiyyətləri bir çox şeyin inkişafına rəvac verdiyi kimi bizim üzlərimizin sayının da artımına əlindən gələn yardımı əsirgəməyib) sizlərdə yoxdur. Bilirəm, bilirəm başını çox ağrıtdım. Ona görə də gerisini daxilimdə fikirləşəcəm.” Bundan sonra gördüyüm şeylər haqqında fikirləşmək istəyirdim, amma həmin mənzərə müəllimimin dərsdə dedikləri yadıma düşdükcə daxilimdə bir iyrənti duyğusu yaranmışdı. Olanlar, yəni tam olaraq nə olmuşdu? Dəqiq deyə bilmərəm, ancaq dəqiq o idi ki, bəlkə də daxilimdə özümə belə etiraf etməkdən çəkindiyim güvən hissi idi bu. Nəyə görə etirafdan çəkindiyimə gəldikdə bir dəfə də bundan xeyli fərqli olsa da, başıma gələn bir hadisə məni insanlar haqqında fikirləşməyə sövq etmişdi, yəni onların ikiüzlülüyü haqqında. Onlar deyərək özümü onlardan ayırdığım üçün oxucunun məni başa düşəcəyinə inanıram. Məsələ burasındadır ki, mən onlar

dediyim kateqoriyanın bir parçası olmağıma görə özümdən kifayət qədər nifrət etdiyim anlar olub. Hətta buna görə ağladığım, bəli, bəli düz oxuyursan, ağladığım, bəzən də axı onlar niyə belədi deyə ağladığım vaxtlar da olub. Bunlar indi, yəni o hadisə başıma gəldiyi, görünməz olduğum o vaxtlarda niyə yadıma düşmüşdü deyə soruşsanız, yəqin ki, adam-ağıllı özümlə oturub danışmağa ancaq onda vaxt tapa bilmişdim. O vaxta qədər yənə insanların etdiyini unutmuş, ya da unutmağa çalışmış, lakin bir dəfə də olsun keçmişi qurcalamamışdım. O gün gördüklərimdən və özümlə danışmağa kifayət qədər vaxtım olduğunu dərk etdikdən sonra axı niyə də bunlar haqqında fikirləşməməli idim. Hər zaman bir ümidlə özümün yanıldığımı, problemin məndə olduğunu deyib durmuşdum. Və göz yaşı tökdüyüm, insanlardan soyuduğum anlarda belə bir az dərinə gedib günahı özümdə tapıb rahatlayırdım. Bəlkə də ona görə ki, günah özümdə olanda onu həll edə bilərdim, amma başqalarında olanda bunu həll etmək o qədər də asan deyil, hətta bəlkə imkansız da deyilə bilər. O gün yenə dərdim təzələnmişdi və üstəlik bu dəfə özümdə də bir günah tapa bilmirdim. Axı o

professora mən deməmişdim ki, namusdan, gecə qış uşağının çölə çıxmasıdan danışsın. Bu da azmış kimi elə rəftar etsin ki, guya o özü bütün bu məziyyətlərə sahib bir namuslu, əxlaqlı, dürüst professordur. Bu dəfə yaman yerdə axşamlamışdıq, amma sözün həqiqi mənasında axşamlamışdıq. Bundan sonra geriyə qalan şey o gün əlimdə olan bu güclə ətraf işıqlandıqda nə etmək istəməyim idi. Əvvəla ağlıma gələn ilk şey bu oldu ki, universitetə bir baş çəkməliyəm. Nə də olmasa, bir müəllimimi bu şəkildə görməyim orada məni sevən digər müəllim və tələbə yoldaşlarımın var olduğu həqiqətini dəyişməzdi. Və bəli, bunu edəcəyimi dəqiq qərarlaşdırdıqdan sonra sevimli ağacım altında fikir dünyasında bir o tərəfə bir bu tərəfə dolaşaraq ətrafın ağarmasını və universitetin açılma vaxtının çatmasını gözləməyə başladım. Nəticədə 3-cü kurs tələbəsi olaraq mənim dərsim 9-un yarısı başlayacaqdı və universitet isə bundan da tez açılacağına görə çox gözləməli olamayacaqdım.... Artıq avtobus dayanacağına gəlib çatmışdım. Səhər tezdən kimi işə, kimi məktəbə, kimi universitetə, kimi də hara gedəcəyini bilmədən harasa getmək üçün

dayanacaqda durmuş və avtobus gözləyirdi. Mən isə tamami ilə fərqli hisslər ilə universitetə getmək məqsədi ilə onların yanında durmuşdum. Gözəgörünməzliyimin mənə vermiş olduğu avantajdan yararlanaraq gah yerdə oturdum, gah çömbəldim, gah yüksək səslə güldüm, amma təbii ki, necə də ayıb, mədəniyyətsiz hərəkətlər sərgilədiyimi mənə deyən olmadı.. o anda əvvəldən mövcud olan bir arzum yadıma düşdü-burada olan, tanımadığım bu insanları qucaqlamaq. İndiyə kimi bunu etsəm yəqin dəli, oğru, sərxoş, əxlaqdan kənar və ümumən, bu kimi bir insan olduğumu düşünəcəklərini bilirdim. Üstəlik onların bir qisminin də  bu sevgiyə nə qədər laiq olması məsələsi var idi. Nə olsun ki, mənim içimdən hamısı qucaqlamaq və onları etdikləri hər şeyə rəğmən, məni anlamamaqlarına rəğmən çox sevdiyimi və bunun səbəbinin də hər birimizin Tanrıdan bir parça olmasında gördüyümü demək keçirdi. Bunu insan nəsli içərisində başa düşəcək və məni dəli adlandırmayacaq nə qədər insan var idi axı?  İndi isə heç bir suala yer qalmadan, heç bir narahatçılığa yol açmadan onları qucaqlaya və onları sevdiyimi burada özlərinə deyə bilərdim. Gecəki macəradan

sonra bu bəlkə bir az məni rahatlatar və qismən də olsa olanları unutmağıma yardım edə bilərdi. İlk olaraq oturacaqda oturan xanıma yaxınlaşdım. O gözəl geyimli, özgüvənli görünən biri idi. Yaşı yəqin ki, 27-28 ola bilərdi, ancaq bunu dəqiq bilmirəm. Üzündəki makyajı da oxucu üçün təsvir etmək lazım gələrsə, dodaq boyasının rəngi çəhrayı idi və buna  uyğun bir çalarda gözünün üzərində də bir boya var idi. Onu da deyim ki, oxucunun məni bu qeyri-dəqiq məlumatlarıma görə günahlandırmayacağını ümid edirəm. Anam, heç olmazsa həm otaq, həm də qrup yoldaşım olan Günəş makyaj edərkən onlara nəzər salsaydım həmin hadisənin yaşandığı zaman gördüyüm bu qadının makyajını tam dəqiqliyi ilə təsvir edə bilərdim. Amma artıq olan olub keçəndə ki keçib. Saçları qara rəngdə və açıq olan bu qız ətrafına bir az da alçaldıcı nəzərlərlə baxırdı. Yəqin edirəm ki, özgüvən ən pik həddinə çatandan sonra insanların səhvən onun davamı saydığı bir mərhələ olan başqalarına yuxarıdan aşağı baxma mərhələsinə daxil olmuşdu. Onun yanında oturdum. Daha sonra qucaqladım. Düzdür, o məni görmürdü, amma sanki mənim onun qucaqladığımı hiss edirmiş kimi

bir reaksiya verdi. Ona onu çox sevdiyimi dedim. Sanki bunu da hiss edirdi. Bütün bunların ardınca hamımızın Tanrıdan bir parça olduğumuzu və buna görə də hamımızın dəyər, sevgi və hörmətə bərabər səviyyədə layiq olduğumuzu dedim. Vaxtımın çox olmadığını nəzərə alaraq onun yanından durub dayanacağın kənarında dirəyə söykənmiş bir şagirdə, şagird deyirəm çünki belindəki 4-5 kiloqramlıq çanta mənə ona belə müraciətim üçün əsas verir, yaxınlaşdım. Bu bir qız idi.  Bir az əvvəlki xanıma etdiyim kimi onuda qucaqlayıb sevdiyimi dedim. Həyatı anlamağa çalışmağı da məsləhət görmək kimi bir cəhd edəcəkdim ki, sonra bunun səhv olacağını düşündüm. Nəticədə bu sonu elə də rahatlıqla və tez gəlməyəcək, bəlkə də heç gəlməyəcək bir iş idi. Mən isə belindəki çantanın altında əzilən bu uşağın yükünü bir az da artırmaq istəmədiyim üçün ona bunu deməkdən çəkinirdim. Tam onun yanından ayrılacağım sırada İncildə deyilən “qonşunu da özün kimi sev”  fikiri xatırladım. Bu fikirdən və etmiş olduğum bir səhvdən sonra gəldiyim nəticə isə bu idi ki, özüm üçün xeyirli saydığım bir işi bütün ağırlığına, çətinliyinə rəğmən edərəm və əgər

belədirsə bu işi başqasına da məsləhət bilib ya da etmək istədiyi zaman ona bunun çətinliyindən çox yekun nəticədə əldə edəcəyi xoşbəxtlikdən danışaraq həvəsləndirməliyəm. Bir halda ki, sonun nə zaman gəldiyini bilməsəm də, özüm bu həyatı anlamağa ən azından çalışırdım, nəyə görə ona da bunu məsləhət bilməyəydim. Bax beləcə sanki bu məktəbli məni görür və eşidirmişcəsinə ona həyatı anlamağa çalışmasını, bunun üçün əvvəlcə özünü anlamalı olduğunu məsləhət bilərək oradan ayrıldım. Orada təxminən 35-40 yaşlarındakı bir bəyə  qarşı da bir az öncə etdiklərimi təkrarladım. Açığı hamımız insan olduğumuza görə burada mənim üçün qəribə bir şey yox idi. Orada olan heç kim ilə qan bağım yox idi, amma qan bağından daha güclü bir bağımızın olduğunu bilirdim. Bir an əgər indi məni görə bilsəydi bu şəxs nə düşünərdi deyə xəyal etdim. Hər halda yuxarıda sadaladığım sonuncu kateqoriyaya-əxlaq normalarından xəbərdar olmayan biri, qeydsiz şərtsiz daxil edərdi. Eybi yox, bundan ötrü onu günahlandıracaq deyiləm. Əvvala, ona görə ki, o mənim haqqında danışdığım bağdan xəbərdar deyilsə, onun burada bir günahı yoxdur. İkincisi də o ona öyrətilmiş olan

normaların tələbi daxilində hərəkət edirdi və ona da bu cür öyrədilmişdi. Bu kişinin üzündə kibirin varlığı o qədər də sezilmirdi, geyimindən iş adamı olduğu və işə getdiyi məlum olurdu. Bir anlıq düşündüm ki, indi Allah bilir beynin içində hansısa işlə bağlı bir məsələni incələyən bu adam, ətrafında olanlardan xəbərdar olmayan bu adam mənim hərəkətlərimə görə məni dəli də adlandıra bilərdi. Tam o sırada avtobusun uzaqdan yaxınlaşdığını gördüyümdəm dayanacaqdakı təxminən 55 yaş verəcəyim bir xanım, 25 yaşlarında ola biləcək bir oğlanı da qucaqlayıb onları nə qədər çox sevdiyimi dedim.  Avtobus çatdıqda mən artıq işimi başa vurmuşdum və avtobusa daxil olaraq pəncərə kənarında ayaq üstə dayandım. Oxucu buna qəttiyyən gülməsin. Bir tələbə olaraq vərdiş etdiyim şeyi təkrar edirdim vəssalam. Eybi yoxdur deyə fikirləşdim.. Yəni bu o qədər də mühim deyil, bəlkə də mühim idi, bu haqda sonra bir də üzərinə qayıdıb fikirləşərəm. Oxucunu bir məsələ haqqında aydınlatmağı vacib hesab edirəm ki, bir az öncə insanlardan özünü ayrı görən, və ya görmək istəyən mənim nə üçün dayanacaqdakı insanlara qarşı belə bir sevgi duymağım heç də qəribə deyil. Çünki....

burada Azərbaycan şairi Molla Pənah Vaqifin bu iki misrasını qeyd etməliyəm:

Uman yerdən küsərlər, bir məsəldir xalq arasında,

Küsdüyüm bica deyildir, aşinadan küsmüşəm.

Yəni mən insanları sevdiyim, onlar da hər dəfəsində bu sevgiyə xəyanət etmək bacarığını göstərdiyi üçün onlardan sadəcə olaraq küsmüş, bəlkə də incimişdim. Axır əsas olan o idi ki, onlardan hələ də ümidimi üzmədiyim üçün yalnız küsmüş, birdəfəlik silməmişdim. İndi isə bu qısa açıqlamadan sonra qayıdaq avtobusa. Hadisələrin sonrakı gedişatının daha maraqlı olduğunu düşündüyümdən oxucunu bu avtobusda çox yubandırmaq istəmirəm.... bir az sonra universitetin qarşısında dayanmışdım. Bəli, bura mənim həftənin beş günü, səhər saat 9-un yarısında  gəlməyə təhkim edildiyim universitetim idi. Bu universitetin adını burada deməyi lazım bilməsəm də, əsas olan şeyi qeyd edirəm ki, mən burada sosial elmlər və psixologiya fakültəsinin sabiq tələbəsi idim və artıq üçüncü il idi ki, bu ünvanı daşımaqla məşğul idim. Bəli bu dəfə məndən tələbə biletimi istəyən olmamışdı. Odur ki,

heç bir əziyyət çəkmədən içəri daxil oldum. Bizim fakültəmizin yerləşdiyi bina o qədərdə uzaqda deyildi. Xalq ifadəmizlə desəm, qapıdan girəndən sonra bir addımlıqda idi. Universitetdə tələbələrin səsi hər yana yayılırdı. Bunu eyni ilə arı pətəyindəki vızıltıya bənzətmək də olar. Görünür, həmin gün mən ora gəldiyim gün də də elə bir dəyişiklik yox idi və köhnə hamam, köhnə tas prinsipini gözləmişdilər. Açığı mənimki də tamam dəlilik idi bura gəlmədiyim, əgər Günəş haqqlı idisə, cəmi 30 gün idi. Nə kimi dəyişiklik olmalı idi axı? Deyəsən, digərlərinə də uçmaq,  işıq sürəti kimi güclərin verilmiş olduğunu gözləyirəmmiş ki, heç nəyin dəyişmədiyini görmək mənə belə təsir etmişdi. Öz binamıza doğru yaxınlaşdım və oradakı mühafizə işçilərinə sanki məni eşidəcəklərmiş kimi salam verərək içəri daxil oldum. Bu binanın beşinci mərtəbəsində mənim fakültəm yerləşirdi. Ora qalxmaq üçün liftə mindikdə fikirləşirdim ki, məni hər zaman çox sevdiyini deyən, istedadımı tərifləməkdən xüsusi zövq alan, qısası məni yerə göyə sığdırmayan müəllimlərim yəqin ki, mənim itmiş olduğumu öyrəndikdən sonra çox pis olmuşdular. Üstəlik hər nə qədər bunu  mən

etməmişdimsə də, gözəgörünməz olaraq onları kədərləndirdiyim üçün özümü də yaxşıca bir danladım. Bu sırada liftdə tək idim və fikirlərimdən ayrıldıqda qapının açılmış olduğunu gördüm və cəld liftdən ayrıldım. Məlumdur ki, fakültələrdə müxtəlif kafedralar mövcuddur. Bu hal bizim fakültəmiz üçün də eyni idi. Odur ki, mən öz qrup yoldaşlarımın olduğu otağı axtarmaqla məşğul ikən kolidor boyunca **sosial və pedaqoji psixologiya**, **gender və tətbiqi psixologiya** kimi kafedra adlarını da görürdüm. Birdən sağ tərəfdə yerləşən otaqların birindən qrup yoldaşlarımın səsini eşitdim. Yenə həmişəki kimi zarafatlar edir, gülürdülər. Bu hal məni əlbəttə sevindirdi. Amma məni hər zaman çox sevdiklərini deyən bu insanlar üçün varlığımın və yoxluğumun elə də bir fərq etmədiyini görüncə kədərlənmədiyimi də deyə bilməyəcəm. Lakin bu hal çox çəkmədi və mən onların nə danışdığını nəyə güldüyünü öyrənmək üçün bir az daha yaxına getdim. Onları görəndə sevinmədim desəm yalan olar. Yəni neçə ildir ki, burada təhsil alıram və ancaq onları görürəm, demək olar ki, onlar mənim ailəm kimi olmuşdular. Üstəlik öz ailəmi elə çox görmədiyimi nəzərə alsaq bu çox təbiidir ki, onları

ailəm yerinə qoymuşam. Bu yazını ortaya çıxardığım təqdirdə bunu oxuyacaq oxucular üçün bir şeyi də aydınlaşdırmalıyam ki, ailəm rayonda yaşadığından onlarla bu üç il boyunca görüşmə sayını maksimum üç olaraq xatırlayıram. Düzü, mən Bakıda işlədiyimdən tətillərdə də evə gedə bilməmişəm. Onlar isə məni sevmədikləri üçün yox, yəni ən azından mən belə düşünürdüm, imkan olmadığından şəhərə gəlmək kimi bir təşəbbüs göstərməyiblər. Nəysə, nəysə.... Bu söhbətlərin yeri deyil indi. Ona görə də qrup yoldaşlarımın yanına qayıdaq. Bəli onlar gülürdülər, amma nəyə, yoxsa kiməmi deməli idim? Bəli, tam olaraq belə deməli idim. Ora çatanda məlum oldu ki, əziz və hörmətəlayiq qrup yoldaşlarımın güldüyü şəxs mən imişəm. Amma burada onu da aydınlaşdıraq ki, sadəcə mən yox, əxlaqı olmayan, əşi artıq keçib, əxlaqsız, namussuz, yerə baxıb ürək yaxan **mən** imişəm. Bax beləcə mən özümün bu mükəmməl definisiyalarımı sizinlə paylaşıram. Bu söhbətin üstündən kifayət qədər vaxt keçdiyindən, onların **məni də özləri kimi çoxdan unutduğunu** nəzərə alaraq tələbə yoldaşlarımın adlarını verməklə bağlı elə bir problem görmürəm....Məsələyə birinci

münasibət bildirən mənim ən yaxın dost dediyim şəxslərdən biri olan **Afət** idi. Onun mənim haqqımda dediklərinə keçmədən öncə bəzi şeyləri deməliyəm. Biz onunla əslində eyni royondan olsaq da, fərqli kəndlərdən idik. Mən universitetə ilk dəfə gələndə də, yəni birinci kursda ilk qarşılaşdığım adam da o idi. Belə demək mümkünsə, ikimiz də ilk gündən dərsə gecikmək kimi nadir görülən bir potensial sərgiləmişdik. Onunla da qapıda qarşılaşdıq və  müəllimin insafına sığınaraq qapını döyük. Görünür, müəllim insaflı adam imiş ki, birinci gün olduğunu nəzərə alaraq bizə sadəcə **"bu nə vaxtın dərsə gəlməyidir, ağılsızlar, keçin içəri, nə durmusunuz orada şəkil çəkdirirsiniz"** deməklə kifayətləndi və biz ilk dərsimizi almaq, daha doğrusu keçmək üçün içəri daxil olduq. O gündən sonra aramızda bir birimizi tale ortağı adlandırmağa başladıq və çox yaxın dost olduq. Mən ondan demək olar ki, heç nəyi gizlətmirdim, yəni gizlətiləsi bir şey də yox idi. Mən əlimdən gəldiyincə ağıllı, sözəbaxan, əxlaqlı biri olmağa çalışırdım. Belə olan təqdirdə gizlətiləcək şeylərin siyahısı sıfıra enir. Əlbəttə sual verilə bilər ki, sözəbaxan olmusan əlin bala batıb? Amma

bilirsiniz, nə var, son zamanlar belə bir fikrə rast gəlmişəm: universitetdə suallar verilir, öyrədilir və tələbələr bundan sonra imtahan olunur, həyatta isə əvvəl imtahan olur sonra sualların cavabı öyrədilir. Belə..... Mən onunla olan tələbəlik macəralarımızdan çox danışmaq istəmədiyimdən Afətlə bağlı olan izahatımı burada bitirirəm. Otağa yaxınlaşanda "tale yoldaşım" haqqımda bu sözləri deyirdi:

"Bilirsiniz, uşaqlar, mən elə əvvəldən bilirdim ki, o bizə özünü göstərir, əslində onun içində nələr var idi, bir mən bilirdim. Bir də görürdüm ikinci növbə dərsdən çıxıb harasa gedir. Soruşanda da deyirdi ki, heç elə belə şeydi. Kitabxanaya gedirəm, nə bilim nə. Guya mən bilmirəm ki, o vaxtı kitabxana açıq olar. Allah bilir elə o vaxtdan....Nə isə, daha mən o sözü ağzıma yaraşdırıb demirəm, özünüz yaxşı başa düşdünüz. Baxanda da camaat elə bilirdi ki, bunun ağzında dili yoxdur. Ona görə yaxşı deyiblər də, suyun lal axanı, insanın yerə baxanı."

Təəssüf ki, bundan sonra deyilən bir neçə cümləni yaza bilməyəcəm, yəni kədərləndiyim üçün yox, onun sözləri ilə desək, qələmimi, daha dəqiqi

klaviaturamı kirləndirməmək üçün.. Ümumilikdə digər bütün qrup yoldaşlarımın məni sevdiklərini, bir-birimizə hörmət etdiyimizi düşünsəm də Afətdən sonra daha yaxşı yola getdiyim ikinci qrup yoldaşım **Vüqar** idi. Ona görə də  otaqda hamının yox bu iki şəxsin danışıqlarını verməyi lazım bilirəm. Bu arada Vüqar söhbətə qarışdı və mən elə düşündüm ki, yəqin Afəti susdurmaq ona yanıldığını demək niyyətindədir. Mən onlara qulaq asa-asa artıq otağın içinə daxil olmuşdum.  Odur ki, Vüqarın dediyi sözləri tam aydınlığı ilə eşidirdim.. Bu sözlər belə idi:

“Nə yalan deyim, Afətə qatılıram, onun elə gecə vaxtı tez-tez harasa getməyi olurdu. Əvvəllər mən bir az yaraşdırmadın filan, amma sonra başa düşdüm ki, vəziyyət o məsələ....”

Sözün bitdiyi yer buna deyirlər yəqin. Görünməsəm belə orada axı bunları necə deyə bilirsiniz, axı siz yaxşı bilirdiniz ki, mən o vaxt universitetdən çıxıb işə gedirdim, sadəcə əvəllər bir az utandığım üçün deməmişdim, sonra isə işləməyim utanılacaq yox, qürur duyulacaq bir şey olduğumu başa düşüb kitabxanaya getdiyimi dediyim günlər əslində işə

getdiyimi sizə demişdim. Doğurdan e? Görəsən, nəyə görə sizə demək ehtiyacı hiss etmişdim? Yəni doğurdan da işlədiyim üçün utanmadığımı göstərmək istəmişdim, yoxsa sizin haqqımda başqa şey düşünməyinizin qarşısını almaq? Həyat, və ya biz insanlar ikimizdən biri çox qəribədir. Amma kimin daha qəribə olduğuna sonra qərar verərik. Əsas odur ki, gördüklərim qarşısında **heyrətdən lal olmaqla** məşğul ikən bu fikirləşdiklərimi qətiyyən demədim, hətta məni görüb eşitmədiklərini bildiyim halda demədən oranı tərk etdim. İş orasında idi ki, bu eşitdiklərimdən sonra ağlaya da bilmirdim. Bəlkə də ağlasam, daha yaxşı, əslində yaxşı olmasa da olar, axır nəsə hiss edə bilərdim. Bu dünən axşamkı macəralarımdan sonra ikinci dəfə idi ki, heç nə hiss edə bilmirdim. Hərçənd müəllimlərimi görməyə artıq nə həvəsim, nə də eşidəcəyim şeylərə tabım qalmadığından oradan nə qədər mümkünsə o qədər tez çıxmaq istəyirdim, amma yenə bu **lənətə gəlmiş maraq** yaxamı buraxmadı və bir az sonra özümü gender və tətbiqi psixologiya kafedrasında əvvəllər ən çox sevdiyim və onun da ən çox sevdiyi tələbəsi olduğumu düşündüyüm müəllimim 65 yaşlı professorumuz

**Cahangir Ağayevin** qarşısında tapdım. Müəllimim otaqda tək deyildi, onunla birgə daha iki müəllim var idi. Onların da mənimlə bağlı fikirlərini bilmək istəyirdim, amma görünür burada qrup yoldaşlarımla olduğum qədər şanslı deyildim ki, mənim haqqımda pis, ya yaxşı danışmırdılar. Sözün əsil mənasında itirib axtarmırdılar desək, yerinə düşər. Ona görə də, kafedradakı masanın ətrafında olan oturacaqlardan birinə əyləşdim və aralarında keçən söhbətə qulaq asmağa başladım. Söhbət də deyəndə ki, yəni elə-belə evdən-eşikdən. Belə məlum olurdu ki, hamının son vaxtlar nəsə pula ehtiyacı var. Əslində onların aralarında keçən söhbətləri nöqtə, vergülünə qədər bura yazmağın təkcə mənə yox, həm də sizə cansığıntısı verəcəyini nəzərə alaraq o söhbətləri burada yazmayacam. Amma onu deyim ki, mən bu söhbətlərə təxminən 1 saata yaxın qulaq asmalı oldum. Bu bir saatın sonunda qulağıma kolidordan bir səs gəldi. Yanılmamışdım, bu Günəşin səsi idi. Üstəlik o mənim haqqımda nəsə deyirdi. Bu səsə başda Cahangir müəllim olmaqla kafedradakı iki müəllim kolidora çıxdı. Həmçinin dərs başlamasına rəğmən onun səsinə qrup yoldaşlarım da bir neçə saniyə

işərisində kolidorda idi. Günəşin mənim tapılmağımla bağlı heç bir iş görülmədiyini, polislərin məsələyə ciddi yanaşmadığını və müəllimlərimiz və tələbə yoldaşlarımızdan kömək istədiyini xatırlayıram. Amma həm təəssüf ki, həm də yaxşı ki, Günəşin bu çağırışına cavab olaraq Cahangir müəllimin bu sözlərini də xatırlıyıram:

” Ay qız, sən də yaxşı görək, universiteti bura yığacaqsan, neyləyim ki itib, cəhənnəmə itsin, deməli  o yolun yolçusu imiş ki....”

Oxucuya məsələnin aydın olduğunu yəqin  edərək **“professorun çıxışı”**nı burada dayandırıram. Bu eşitdiklərim mənə kifayət etmiş olacaq ki, məsələnin axırını dinləmədən oranı tərk etdim. Və yenə heç nə hiss edə bilmirdim!.... bir azdan universitetin həyətində idim. Yerə oturdum, ağlamaq istədim, həqiqətən həyatımda ilk dəfə bu qədər çox ağlamaq istədim. Üstəlik insanlar məni görmürdü, nə dəli olub  deyən, nə də yazığı gəlib: “Aaa, sizə nə olub, xanım?” deyən olmayacaqdı, yəni tam fürsət idi. Amma əldən nə gələr ağlaya bilmirdim. Axırda özümü ağlamağa məcbur etmək fikrindən daşındım və içimdəki hisssizliyimi də

alaraq ayağa durdum. Ətrafıma baxdım. Lakin sadəcə baxdım. Və o an elə indiyə qədər, yəni görünməzlik macərasına atılana qədər də sadəcə baxmış olduğumun fərqinə vardım. Baxmış və görməmişdim. Son zamanlar William Walker Atkinson adlı bir psixoloqun yaddaşla bağlı oxumuş olduğum bir əsərində bu feillərin yəni **to look at(nəyəsə baxmaq)** və **to see(nəyisə görmək)** feilərinin arasındakı fərq detalları ilə izah olunurdu və bir şeyi tam başa düşmək, sonra isə xatırlamaq üçün ona baxmaq yox, görməyin lazım olduğunu yazılırdı. Səmimi olum ki, bunu oxuyanda o qədər də başa düşməmişdim. O an orada, insanların tam ortasında, içimdəki hisssizliyim ilə baş-başa olduğum o anda, tam olaraq o anda yavaş-yavaş anlamağa başlamışdım. Amma bir yandan da indiyə qədər sadəcə baxdığımı və görmədiyimi və bunun yekununda da heç nəyi başa düşməmiş olduğumu düşünəndə sadəcə olaraq ölmək istəyirdim. Bəli tam olaraq bunu istəyirdim.  Amma bu istəyimi belə tam olaraq hiss edə bilmirdim. Məni bu fikirlərimdən arxadan gəldiyini eşitdiyim bir səs-Günəşin səsi ayırmışdı. Çevrildim. Binanın qarşısında dayanmış və telefonla danışırdı. Üstəlik

danışığından belə məlum oldu ki, mənim rayondakı ailəmlə danışır. Heç nə hiss edə bilməyən mən qeyri-iradi olaraq dinləmək istəyi ilə onların danışığına qulaq asmağı qərara aldım. Bunu etmək də hər hansı bir məqsədim var idimi, yoxsa sadəcə olaraq etmişdim bu haqqda danışmaq istəmirəm. Günəşin səsi çox hərarətli idi, sanki döyüş meydanının ortasında tək qalmışdı və qarşısındakı böyük bir orduyla vuruşurdu. Məğlub olmamaq üçün sonuna qədər vuruşmaq niyyətində olduğu da görünürdü. Sadəcə onun telefonda ailəmə bu sözləri dediyini xatırmayıram:

“ Siz bunu necə deyə bilərsiniz? O sizin qızınızdır, neçə ildir onu tanıyırsız, amma bu dediyiniz şeyləri etməyəcəyini isə hələ də öyrənə bilməmisiniz. Eybi yoxdur, mən onu 3 ildir tanıyıram, lakin onun bu dediklərinizi etməyəcəyini yaxşı bilirəm.....Necə, insanlar dəyişir? Haqlısınız, amma əsil insanlar bir balaca çətinə düşəndə şəxsiyyətlərini itirmirlər.. Yəni sizin kimi, sağ olun, bir də səsinizi eşitməmək arzusu ilə... Eybi yox, Dəniz mən özüm səni tapacağam..”

Hı, hı, hı... ola bilməz. Axı mən bu insanların hamısına nə etmişəm? Nə etmişəm? Mən onlara yox əsas özümə nə etmişəm, Dəniz? O an ya hər şeyin bitdiyi, ya da başladığı an idi. Amma bunu zaman göstərəcəkdi. Bir az sonra Günəş əsəbi addımlarla, həm də çox sürətli bir şəkildə gəlib mənim yanımdan keçdi və mən yalnız onda ordan nə qədər tez çıxsam o qədər yaxşı olacağının fərqinə vardım. Universitetin həyətindən çıxışa doğru irəliləməyə başladım. Yenə də insanların üzləri gözlərimin önündən sözün həqiqi mənasında bir film kimi keçirdi. Amma mən də keçirdim. Hara getdiyimi, niyə getdiyimi bilmədən sadəcə keçirdim. Keçirdim keçməsinə də bu yol bitmək bilmirdi. Hər şey boş və mənasız idi. Bəs yaxşı hər şey bu qədər boş idisə onda nəyə görə var idi? Sadəcə dünya boş qalmasın deyəmi? Dünya nə idi? Bu mənasızlıqlarla dolu bir yermi? Əslində elə mən də kifəyət qədər mənasızam, onda nəyə görə varam? Onlar bu mənasızlıqları görmürlər deyə hələ də varlar, bəs mən??..... Yox, ölməliyəm. Bir dəqiqə. Ölmək üçün əvvəlcə ölən insanın yaşaması lazım deyil, mən ki, yaşamıram. Amma nə fərqi var, bir halda ki, vəziyyət belədir... yox heç nə

bilmirəm. Sadəcə içimdəki bu hisssizlikdən bir an öncə qurtulmaq istəyirəm və bu ancaq ölsəm mümkündür. Deməli, ölməliyəm... özümlə baş tutan bu söhbətimdən sonra, doğrusu görünməz olmağa başladığım andan tez-tez özümlə söhbət edirdim ki, bu  görülməmiş bir hal idi, içimdəki hissizliklə birgə bir neçə dəqiqə sonra küçədə idim. Yenə də tamami ilə qeyri-iradi olaraq avtobus dayanacağına gedib oradakı oturacağa əyləşdim. Ayaq üstə gəzinən bir bəy xaricində heç kim yox idi. Orada nə olduğunu dəqiqliklə xatırlamıram, amma o bəyə zəng gəldiyini və onun da zəng edən adamla danışdıqdan, daha doğrusu ona saysız-hesabsız komplimentlər yağdırdıqdan sonra telefonu söndürüb telefonda danışdığı adam haqqında bu sözləri dediyini:

“ Düşük!”

Və mənim səbəbini bilmədən oradan durub getdiyimi xatırlayıram. İş burasındadır ki, dayanacaqdan ayrıldıqdan sonra yavaş-yavaş səbəbini anlamağa başlayırdım. Bilmirdim, yəni ən azından o an sadəcə keşkə anlamasaydım dediyimi sonra isə artıq bunun da elə bir əhəmiyyət kəsb

etmədiyini düşündüyümü xatırlayıram. Hara getdiyimi  və nəyə görə getdiyimi isə yenə də qətiyyən bilmirdim. Açığı bəlkə də bilirdim, sadəcə bunu özümə deməyə qorxurdum. Dayanacaqdan təxminən 15 metr bir məsəfədə böyük bir otel var idi. Var idi deyəndə ki, həmişə olub. Amma bu dəfə özümün də bilmədiyim bir məqsəd məni ora girməyə vadar edirdi. Dediyim kimi, bəlkə də bilirdim. Gedirdim. Gedə-gedə yenə insanları görürdüm, onlar məni görmürdülər. Çünki gözə görünməz idim. Bir anlığa beynimin içində bir sual yarandı:

**“Görəsən, bu hadisə olmamışdan öncə onlar məni görürdü, yoxsa sadəcə mən gördüklərini zənn etmişdim?”**

Amma bir şey var ki , ən çətin vəziyyətdə belə, yəni bütün hisslərimi itirdiyim vaxtlardan danışıram, yumor hissimi itirməmiş olacam ki, öz-özlüyümdə bunları fikirləşdim:

“Shakespeare bu yerdə yaxşı deyib: To be, or not to be, that is the question(olmaq və ya olmamaq, əsas sual budur). Mənim vəziyyətimi hər nə qədər tam aydınlığı ilə ifadə etsə də Shakespeare-ə əlavə

etmədən keçə bilməyəcəyim üçün ardıyca bunu əlavə etdim:

**“Görmək, və ya görməmək, əsas sual budur.”**

Eh, Dəniz, dəniz, adamın nəyi də olmasa gərək səninki kimi yumor hissi olsun, çünki bütün hisslərin itdiyi halda o hələ də səni tərk etməyib və ona çevrilib baxacağın anı gözləyib. Bax belə mən bu kimi fikirlərlə məşğul ikən bir də onda ayıldım ki, artıq otelin qarşısındayam. Bir müddət otel ilə baxışdıqdan sonra sadəcə olaraq səbəbsiz bir şəkildə içəri daxil oldum. Burada bir qrup başqalarının önəmli kateqoriyasına daxil etdiyi tipdə insanlar var idi, amma mən bu insanlar haqqında və otel haqqında danışmaq niyyətində deyiləm. Ona görə də mətləbdən kənarlaşmamaq üçün orada gördüyüm lift haqqında danışmağa başlaya bilərəm. Yəni lift normal bir lift idi. Məsələni qəribələşdirən, mənim onu görən kimi içərisinə daxil olmağım və ən sonuncu mərtəbə üçün-21 düyməsini basmağım idi. Görünür, heç kim məni görməsə də lift mənim varlığımdan xəbərdar imiş ki, məni birbaşa heç kim üçün dayanmadan 21-ci mərtəbəyə qaldırdı. Qapı açıldı

və mən liftdən düşdüm. Mənim burada nə işim var idi..Görəsən bura gəlmək haqqında fikirləşəndə hansı niyyətdə olmuşdum? Artıq heç bir fikrim yox idi. Bu vəziyyətdə ikən ağlıma ilk gələn şey yerə oturmaq oldu. Oturdum da, onsuz da heç kim məni görmürdü, yəni dəli olduğumu deyən olmayacaqdı. O an fikirləşməyə başladım hər şeyi. Görünməz olduğum andan bu yana başıma gələnləri, Günəşi, gecə gördüklərimi, hörmətli professoru, ağacla olan söhbətimi, dayanacaqda insanlara dediklərimi, universiteti, müəllim və tələbə yoldaşlarımı, sonra yenə Günəşi, onun ailəmlə danışığını, sonra yenə avtobus dayanacağını və nəhayət burdayam-heç vaxt içində olmadığım, indi isə bura niyə gəldiyimi bilmədiyim bir otelin 21-ci mərtəbəsində içimdəki hissizliyimlə, amma ədalət naminə yumor hissimi saymıram, birgə oturmuşam. Ətrafa baxıram və daha da qəribə olan şey sadəcə baxmıram həm də görürəm...Ayağa qalxdım və gəzinməyə başladım. Buranı analiz etm

ək niyyətim yox idi, amma səbəbsizcə gəzdiyim bir anda bir şey diqqətimi çəkdi. Bu otelin çatısına açılan qapısı idi. Bir neçə saniyə içərisində artıq

qapını açmış və ordan ayağımın altında qalan şəhəri seyr etməkdə idim. Saçlarıma toxunan küləkdən belə məlum olurdu ki, tək mən şəhəri deyil, o da məni seyr edirdi.  Bu külək sanki saçlarımı oxşayır, mənim kədərimə ortaq olurdu. Qəribədir, amma bu mənim həmin andakı hisslərimdir. Özüdür ki, var səhv oxumursan əziz oxucu həmin anda dünəndən bəri donmuş olan hisslərim yavaş-yavaş açılmaqda idi. Artıq yaşadığımı, ən azından həyatda olduğumu bilirdim. Mən bura niyə gəlmişdim. Aşağıya doğru baxdım, çox yüksək idi, bəlkə də adi bir vaxta bu yüksəklikdən qorxa bilərdim, lakin nədənsə o an heç bir qorxum yox idi. Görünür, bu hissim ya hələ oyanmamışdı, ya da oyansa da qorxuya dəyər  bir şey görmürdü.  Durmadan ətrafa baxırdım, maraqlı olan isə o idi ki, artıq görürdüm də. Özümə ilk sualım bu idi-görməyimə dəyir, yoxsa görməsəm bundan daha yaxşı olardı? Bir anlığına yaşadıqlarımı yenidən düşündüm və bu qərara gəldim ki, hər şeyə rəğmən buna dəyərdi. İnsan qəribə varlıqdır, bilmirəm bəlkə də yoxluqdur. əsas məsələ bundadır ki, çıxardığım nəticəyə görə indiyə qədər görəcəklərimdən qorxduğum və ya yekun

nəticəsindən qorxduğum üçün həqiqətlərdən qaçmışam. Bəli bu gün o gündür. Həqiqətlərlə üzləşməli olduğum gün-həm də nəyin bahasına olursa olsun. Bir də aşağıya baxdım. Aha, indi bura niyə gəldiyimi başa düşürüəm. Bunun səbəbi ölmək istəyimi rahatlıqla reallaşdırmaqdır. Hisslərim hər nə qədər açılmağa doğru getsə də, ölmək istəyim qalmağa davam edir. Bu qərarımda, deyəsən, qətiyyətliyəm. Ölümdən qorxmuram. Hə, buradaca çox rahatlıqla ölə bilərəm. Onsuzda heç kim məni görmür. Səssizcə, heç kim görmədən.... Axı bir az əvvəl dedim ki, yaşamayan biri necə ölə bilər? Əgər mən yaşamıramsa necə ölə bilərəm? Bu doğurdan da maraqlı, həm də yetərincə dolaşıq sualdır. Qısası, dərsdə bu sualın cavabını öyrədən olmadığından onu dolaşıq adlandırıram, çünki düşünmədən cavab vermək çətin məsələdir. Bu sual olsa idi ki, Makedoniyalı İskəndər nə vaxt ölüb, dəqiqə cavabını verə bilərdim, yəni o öləndə onun yanında olmamışam, amma nə eybi var sənə öyrədiləni deyəndə sual verən şəxs razı qalır, əsas məsələ də budur. İş orasındadır ki, bu dəfə bu sualı verən özüməm və bunun cavabını isə indiyə qədər hələ bir dəfə də olsun fikirləşməmişəm. Demək

belə, əvvəlcə oradan başlayaq ki, mən indiyə qədər, hətta güman edirəm ki, indidə yaşamamış və yaşamıram. Burdan bu nəticəyə gəlirəm ki, ölmək üçün əvvəlcə yaşamaq şərtdirsə, deməli indiyə qədər yaşamamış olan mən bundan sonra yaşamalıyam. Məsələ yaşamaqda deyil, bütün bu gördüklərimdən sonra yaşamağa dəyib dəyməməyindədir.........İnsanlar məni bu dəfə də yanıltmadılar. Onlara olan inamımı bir dəfə daha məhv etdilər. İndi yenidən onlarla yaşamaq, onlara şans vermək , yox bunu edə bilmərəm. Üstəlik bu sualın cavabını tapmaq üçün Allahdan kömək istəyib, istəməməyim məsələsində də qəti qərara gələ bilməmişəm. Nəticədə imtah zamanı kömək alaraq sualın cavabını tapmaq ədalətsizlik, həm də acizlikdir. Hələ onu demirəm ki, mənə verilən görünməzlik gücü onsuz da çox böyük bir şeydir. İmtahana girməyimə şans verilmişkən bir də utanmazca mənə verilən suala cavabı soruşa bilmərəm. Yox, bilmərəm, hiss edirəm, Tanrım bu suala özümün cavab verməyimi istəyir.....Qayıdaq əsas məsələyə. **Bu dəfə insanlara yox özümə şans verəcəm!!!** Tapdım. Elə məhz bunu edəcəm. **Mən bu şansa layiqəm**. **Verilən bu şansı sonuna qədər**

**də dəyərləndirməyə söz verirəm**. **Artıq onlar üçün deyil, bu dəfə özüm üçün yaşayacam**.... Hələ də bəzi suallarım var –bəs yaxşı bir də onların üzünə baxacam, onlarla danışıb güləcəm, yoxsa insanlara üz çevirəcəm? Axı həmişə hər bir insanın Tanrıdan bir parça olduğuna inanmışam. İndi onlara üz çevirsəm, Tanrıya da üz çevirmiş olmaram? Bəs yaxşı, əgər onlar Tanrıdan bir parçadırsa, nəyə görə elə davranmırlar. Bilirəm ki, Tanrım mənə gülməz, mənə inanar, səhv etsəm də küsməz, həmişə durmağım üçün mənə əlini uzadar, məni heç vaxt tək buraxmaz-onların əksinə. Bəlkə də bir vaxtlar adını xatırlamadığım bir kitabda oxuduğum və inandığım kimi sadəcə olaraq Tanrıdan bir parça olduqlarını unudublar. Əgər unutmamış olsaydılar heç vaxt belə davranmazdılar. Hə, ən azından hazırda gələ bildiyim ən yaxşı nəticə budur. Və deyəsən elə son nəticə də budur, axı **insan** sözünün mənası da ərəbcə nəsiyə-**unutmaq** deməkdir. Görünür qənaətimdə yanılmıram. Nə olsun ki, bəziləri bu sözü ünsiyyə-ünsiyyət deyə yozmağa çalışır. Bu o qədər də vacib deyil. Bir halda ki, mən artıq başqalarının yox özümün fikirlərimlə hərəkət etməyə qərar vermişəm, vəssəlam. Nə deyirsən?

İndi Dəniz, onları yenə də bağışlayaq? Necə, bağışlayım, amma unutmayım? Yox, yox deyəsən çətinə düşəndə baş istər, istəməz işləyir. Əla. Burada razılaşdığımıza görə...Bir dəqiqə....Günəş..Mənim əziz qrup və otaq yoldaşım..Yox, bundan sonra həm də əziz və hömətli dostum. Çıxmamış candan ümid kəsilməz. Günəş var, üstəlik yəqin ki, dünyada hələ nə qədər unutqanlıq dərdinə düçar olmayan Günəşlər də var.......Burda deyiblər ki, sən saydığını say gör fələk nə sayır. Hər şeyin bu qədər yolunda göründüyü bir anda yadıma düşən həqiqət-indiyə qədər yaxşı idi, amma indi bu görünməzlik bir dərd halına gəlmişdi. Yenidən görünməyin mütləq bir yolu olmalıdır. Fikirləş, Dəniz, fikirləş..Mütləq bir yolu var, amma nədir? Bu hadisə nə vaxt baş verib? Düzdür, Günəş 30 gündür deyirdi, lakin mənə görə ev yiyəsinin gəlməli olduğu gün. Ya da belə də deyə bilərik ki, markerlə divarı yazmış olduğum günün sabahı. Hə, yəni...Nə yənisi, mən ora nə yazmışdım.? **I have a dream-Mənim bir arzum var**. Hə, hə, belə yazmışdım. Hərçənd arzumun nə olduğunu dəqiq bilməsəm də belə yazmışdım. Arzumun dəqiq nə olduğunu bilməsəm də....Yox, deyəsən bilib

yazmışdım. İndi, bu an burada durduğum an ən böyük arzumun nə olduğunu və artıq həyata keçmiş olduğunu bilirəm. **Mən azad olamaq, özüm olmaq və başqalarının istəyinə görə yox, özüm istəyimə görə yaşamaq istəmişdim**. İndi isə bu arzumu yerinə yetirmişəm. Görünməz olduğum andan bəri nə etmişəmsə, hamısını azad şəkildə etmişəm. Hazırda isə bundan sonrakı həyatımı da belə yaşamaqda qətiyyətliyəm....Tapdım!!!..Hə, artıq bilirəm. Necə görünəcəyimin yolunu tapdım...... Bu möhtəşəm kəşfimin ardından özümü öldürmək üçün çıxdığım 21-ci mərtəbədən yaşamaq naminə hansı sürətlə endiyimi özümdə xatırlamıram. Oxucunu yormamaq üçün burada onu deyim ki, oradan çıxan kimi bir başa Günəşlə birgə qaldığımız evə yollandım. Əlbəttə ki, avtobusla. Təsadüfün də beləsi... Bu, səhər məni universitetə gətirən həmin sürücü idi. Zamanın necə keçdiyini bilmədən bir də onda ayıldım ki, artıq evin yanındayam. Avtobusdan düşdüm və cəld evə girdim. Günəş evdə idi, dünən onu burada qoyduğum yerdə yenə də kədərli bir halda otururdu. Tək fərq isə bu gün dünənkindən də pis vəziyyətdə olmasında idi. Həmin yazı isə yenə də

divarda durmaqda idi. Əvvəlcə cəld pul qabımı tapdım. Sonra isə içindən avtobus kartımı götürüb evdən çıxdım. Az sonra dayanacaqda idim və bir neçə dəqiqə əvvəl məni burada düşürmüş olan avtobusu gözləyirdim. Açığı yarım saat gözlədim. Eybi yoxdur, işin ucunda vicdanımın rahatlığı varsa buna dəyərdi....avtobus gəldi və mən heç kim görmədən avtobusa minib ödəmədiyim gediş haqqlarını ödədim və avtobusdan düşdüm. Evə qayıdarkən yolda bu sabahkı başqa ölkələrə səyahət fikrim yadıma düşdü. Nə olar. Yenə də səyahət edərəm. Amma vicadanımın xətrinə dəymədən....evdəyəm. Günəş evdə deyil. Bəlkə də harasa gedib. Amma bu hadisələrin baş verdiyi müddətdə artıq saat günortanı keçib. Yəqin ki, marketə getmiş olar. Mən isə əlimdə su, dəsmal yazdığım yazını divardan təmizləyirəm.....Aha artıq tərtəmizdir..... əgər oxucu bunun səbəbini düşünürsə, mənimki də, söz deyil, əlbəttə ki, düşünür, deməliyəm ki, bu arzu həyata keçibsə, bu yazının burada qalmağına da ehtiyac yoxdur. İndi artıq onun yerinə başqa bir şey, bu dəfə ümid edirəm ki, daha dəqiq, qorxmadan bir başa istədiyim şeyin özünü yazmalıyam. Amma əvvəlcə

bu haqda fikirləşməli sonra yazmalıyam. ...Təxminən 10 dəqiqə heç bir şey etmədən yatağımın üzərində oturdum. Sonra Günəşin evə girdiyini gördüm. Və bunun ardınca həm ümid etdiyim, həm də qorxaraq gözlədiyim hadisə baş verdi. Günəş məni görmüş və ağlayaraq qucaqlamışdı. Bu əsnada bir çox şey deyirdi, arabir danlayırdı da. Məsələ bu vaxta qədər harada olduğuma gələndə isə mənim ona dediyim: "xahiş edirəm, məndən heç nə soruşma" sözlərim kifayət etdi və heç bir şey demədi. Sadəcə maraqlı bir şey oldu. Günəş boynuma sarıldığı bir anda gözüm güzgüyə sataşdı və mən artıq özümü görürdüm. İndi, əminəm, görünməz olduğumun fərqinə vardığım o gün problem nə güzgüdə, nə də Günəşin gözlərində idi. Yox, problem mənim gözlərimdə idi. Budur. İndi mən özümü gördüyüm anda artıq Günəş də məni görür, güzgü isə əks etdirir...........